**UOT:** 297.
**KBT:** 86.39
**DOI:** 10.33864/2617-751X.2024.v7.i1.64-76
**MJ №** 199

# Əbu Hənifə və Rəy məktəbi

**Abdulla Əliyev***
**Aslan Həbibov****

**Abstrakt.** Bilindiyi kimi erkən İslam dövründə yəni Hz. Peyğəmbər və səhabə dönəmində verilən suallara cavab tapmaq çətin deyildi. Lakin daha sonrakı dövlərə baxdığımızda görürük ki, bir çox yeni mədəniyyətlərə mənsub islamı yenicə qəbul etmiş şəxslər yeni suallar verirdilər. Bu suallara Quran və Sünnə ilə cavab vermək o qədər də rahat deyildi. Bu səbəbdən də Küfə alimləri rəylə ictihaddan istifadə etməyi zəruri hesab etmişdilər. İctihad edərkən rəyə müraciət etdikləri üçün həmin dönəmdə və günümüzdə bir çox tənqidlərə məruz qalmışlar. Əhli-rəyi ən çox tənqid edən əsas 2 məktəbdən biri olan əhli hədis məktəbi olmuşdur. Hədis məktəbi fiqhin formalaşdığı ilk dövrlərdən etibarən, İraq məktəbini şəri hökmlərin istinbatında kitab və sünnəni tərk edərək, əqli metodla əldə olunan hökmlərə üstünlük verməkdə ittiham etmişlər. Bəhs etdiyimiz bu əqli metod bəlli tarixi dövrlərdə bəzən rəy, bəzən qiyas, bəzən də istehsan adı ilə tənqid hədəfi olmuşdur.

Əhli-hədisin tənqidlərinə məruz qalan məşhur alimlərdən biri də Əbu Hənifədir. Bu məqalədə Əbu Hənifənin həyat və yaradıcılığına, əsərlərinə və rəy məktəbinə nəzər yetrilib.

**Açar sözlər:** Fiqh, Əbu Hənifə, məzhəb, əhli-hədis, əhli rəy

## 1.Giriş

Fiqh ərəb mənşəli bir sözdür. "Bir şeyin mahiyyətini və incəliklərini qavramaq" mənasındadır. Qurandada fiqh bir elm deyil, "incə anlayış, kəskin qavrayış və danışanın məqsədini anlamaq" mənasında işlənmişdir. "Fəqih" "bir şeyi yaxşı bilən və yaxşı başa düşən" deməkdir.

* Azərbaycan İlahiyyat İnstitutunun "İslamşünaslıq ixtisası" üzrə magistrantı; Bakı, Azərbaycan (məsul müəllif)
E-mail: abdullaeliyev2023.@gmail.com
https://orcid.org/0009-0004-6318-7121
** İlahiyyat üzrə fəlsəfə doktoru, dosent,
AMEA, akademik Z.Bünyadov adına Şərqşünaslıq İnstitutunun elmi işçisi; Bakı, Azərbaycan
E-mail: aslanhabibov@ait.edu.az
https://orcid.org/0000-0002-3016-3324
**Məqaləyə istinad:** Əliyev, A., & Həbibov, A. [2024] Əbu Hənifə və Rəy məktəbi. *"Metafizika" jurnalı, 7(1),* səh.64-76.
https://doi.org/10.33864/2617-751X.2024.v7.i1.64-76

**Məqalənin tarixçəsi:**
*Məqalə redaksiyaya daxil olmuşdur: 13.11.2023*
*Təkrar işlənməyə göndərilmişdir: 11.12.2023*
*Çapa qəbul edilmişdir: 29.01.2024*

Onun cəm halı "füqəha"dır. Fiqh alimləri insan davranışlarını kateqoriyalara ayırmış və onlara fərz, vacib, sünnə, müstəhəb, mübah, məkruh, haram kimi hökmlər vermişlər. Fiqhdə fətva dilində tez-tez işlənən digər terminlər yəcuzu (caizdir, uyğundur), lə yəcuzu (caiz deyil, uyğun deyil) kimi ifadələrdir.

İslamda Məhəmməd peyğəmbərdən sonra dini qaydaları müəyyənləşdirmək və formalaşdırmaq üçün yola çıxan alimlər günün şərtləri və onların gətirdiyi yeni problemlər qarşısında şəriət hökmlərini açıqlamışdırlar. Müəyyən edilmiş hökmləri dəlilləri ilə bilmək və eyni dəlilləri tənqid edib yeni şərhlər etmək bacarığı müxtəlif fiqh anlayışlarının və məzhəblərinin formalaşmasına səbəb olmuşdur. Müsəlmanlar arasında şəriətdən fərqli olaraq fiqhdə müqəddəslik yoxdur, müxtəlif coğrafiyalar və icmalar arasında fərqli və sərt tənqidi məzhəblər geniş yayılmışdır.

Fiqh üç əsas hissəyə bölünür: 1. Əməllər 2. Cəzalar 3. İbadətlər. Getdikcə daha çox yayılan “İslam hüququ” ifadəsi əslində fiqhdə Muamelat və Ukubat sahələrinə aiddir. Günümüzdə dünyəvi meyllərin artması ilə fiqh xüsusilə ibadətlə bağlı bir sahə kimi görünür.

Bilindiyi kimi ilk dövrdən günümüzə qədər 200-ə yaxın fiqhi və etiqadi məzhəb olmuşdur . Onlardan sadəcə daha sonra insanlar tərəfindən toplu şəkildə qəbul edilib əməl olunan məzhəblər günümüzə gəlib çatmışdır. Günümüzdə Əhi-sünnə məzhəbləri arasında ən gəniş yayılmışı fiqh məzhəbi Hənəfi məzhəbi olmuşdır. Hənəfi məzhəbinin qurucusu olan Əbu Hənifə hər nə qədər özü bir məzhəb qurduğunu deməsədə daha sonralar onun adı ilə bağlı olaraq Hənəfi məzhəbi formalaşmışdır.

## 2.Əbu Hənifənin həyat və yaradıcıllığı

### 2.1.Həyatı

Mənbələr Əbu Hənifənin 699-cu ildə Kufədə doğulduğunu qeyd edir [Muhammed Əbu Zəhra, s.130]. “İmamı Əzəm” ünvanı ilə tanınan Əbu Hənifənin tam adı Əbu Hənifə Nöman ibn Sabit əl-Kufidir. Əbu Hənifənin ata-babalarının ərəb olmadığı dəqiq bilinir. Bəzilərinə görə Əbu Hənifə fars, [Galip Türcan,s.491] bəzilərinə görə isə türk əsillidir[Osman Keskioğlu,s.10].

Əbu Hənifə künyəsinə gəldikdə, onun Hənifə adlı qız övladının olmadığı Həmmad adlı bir oğlu olduğu rəvayət olunur [Muhammed Əbu Zəhra, s.20]. Əbu Hənifə künyəsi ilə bağlı iki ehtimaldan bəhs edilir:

İraqda “hənif” adlandırılan yazı ləvazimatını həmişə yanında gəzdirdiyi üçün bu adı almışdır [Səyid Afifi, s.8]. Doğru yola sadiqliyinə görə, ona “hənif” ünvanı verilmişdir [Səyid Afifi, s.7].

Əbu Hənifə767-ci ildə Bağdadda vəfat etmişdir. Onun Abbasi xəlifəsi Mənsur tərəfindən həbsxanaya atıldığı rəvayət olunur [İbn Həcər Heytəmi, s.151]. Əbu Hənifənin həbsxanaya atıldığı qəbul olunsa da onun həbsxanada döyülərək yoxsa zəhərlənərk öldürüldüyü və yaxud həbsxanadan çıxdıqdan

sonra öldüyü ixtilaflıdır [Muhammed Əbu Zəhra, s.82]. Əbu Hənifə Bağdadda Xəyzüran qəbristanlığında dəfn edilmişdir [Korkmaz, Zehra & Yılmaz, Hayati, s.1159].

**2.2.Təhsili**

Əbu Hənifə hələ uşaq olanda Quranı başdan sona əzbərləmişdir. Qiraət elmini məşhur yeddi qiraət imamından biri olan İmam Asimdən öyrənmişdir [İbn Həcər Heytəmi, s.265]. Kufə və Bəsrə şəhərlərinin tanınmış alimlərindən ərəb dili, ədəbiyyat, hədis, fiqh və s. dərsləri almışdır. Rəvayətə görə, müsəlmanlar Xorasanı fəth etdikdə o tərəflərin sayılıb seçilənlərindən olan Əbu Hənifənin babası da əsir alınır. İslamiyyəti qəbul etdikdən sonra isə azad edilir və Kufə şəhərində məskunlaşır. Əbu Hənifənin babası və atasının Kufədə Həzrət Əli (r.a.) ilə görüşdüyü nəql olunur. Atası Sabit Allahın ona xeyirli bir övlad verməsi üçün Həzrət Əlidən (r.a.) xeyir-dua almışdır [Muhamməd Əbu Zəhra, s.16].

Əbu Hənifə 720-ci ildən etibarən on səkkiz il məşhur fəqih Həmmad ibn Əbu Süleymandan dərs almış, onun elm məclisinin daimi üzvlərindən olmuşdur. Tələbələr arasında çalışqanlığı, dərin elmi və zəkası ilə seçilən Əbu Hənifə bəzən müəllimi olmayanda onun yerinə dərs deyirdi. İraq fiqh məktəbinin ustadı sayılan Həmmad 738-ci ildə vəfat edəndə 40 yaşında olan Əbu Hənifəyə müəlliminin yerinə dərs demək təklif edilir. Əbu Hənifə də bu təklifi müəlliminin tələbələrindən ən azı on nəfərin bir il ərzində onun dərslərində iştirak etməsi şərtilə qəbul edir [Mustafa Uzunpostalcı, s.132]. Əbu Hənifənin məqsədi həm elmi metod və ənənəni qoruyub saxlamaq, həm də bu elm məclisini ictihad şurasına çevirmək idi. Son dərəcə təmkinli, təvazökar və bəsirətli insan olan Əbu Hənifənin dərslərində İslam diyarının hər tərəfindən elm həvəskarları iştirak etmiş və onun rəhbərliyi altında böyük bir məktəb meydana gəlmişdir. Bu məktəbin təxminən 4000 tələbəsi olmuş, qırxa yaxın tələbəsi isə müctəhid səviyyəsinə çatmışdır. Əbu Hənifə İbrahim ən-Nəxai, Şəbi, Qazi Şüreyh, Əlqamə ibn Qeys, Məsruk ibn əl-Əcda kimi böyük fiqh ustadlarından da fiqh elmini öyrənmiş, biliklərini onların ümman kimi zəngin elmi ilə zənginləşdirmişdir. Dövrünün alimləri arasında dərin elmi və fəziləti ilə güclü nüfuz qazanan, yeni bir cığır açan, bir çox alimlər yetirən Əbu Hənifə "İmam Əzəm" (böyük imam) ünvanını almışdır [Mustafa Uzunpostalcı, s.131].

Əbu Hənifənin tabiun alimlərindən olub-olmadığı ixtilaflı məsələlərdəndir. Bəziləri onun tabiun alimlərindən sayır [Şaranı, c.I, s.52]. Əbu Hənifənin bir sıra səhabələri gördüyü, yeddi səhabədən hədis rəvayət etdiyi iddia edilsə də, bu iddianı təsdiq edəcək dəqiq məlumat yoxdur. Düzdür, Əbu Hənifənin zamanında Ənəs ibn Malik, Abdullah ibn Əbu Əvfa, Səhl ibn Sad və Əbut-Tufeyl Amir ibn Vəsilə kimi səhabələr sağ idilər. Ancaq ehtimal olunur ki, Əbu Hənifə müxtəlif şəhərlərdə yaşayan bu dörd

səhabədən yalnız Ənəs ibn Maliki kiçik yaşlarında Kufəyə gələndə görmüşdür [Mustafa Uzunpostalcı, s.132].

Əbu Hənifə Cəfər əs-Sadiqdən hədis rəvayət etmişdir [Məhəmməd Əbu Zəhra, İmam Cəfər, Qahirə, Dəru əl-fikru əl-arabiyi, 2008, s.41]. Mənbələrdə Əbu Hənifədən “Son iki il olmasaydı Nöman həlak olardı” sözü nəql olunur [Zehra Korkmaz, Hayati Yılmaz, c.1, s.21]. Ancaq Əbu Hənifənin Cəfər əs-Sadiqdən dərs aldığına dair ilk dönəm qaynaqlarda heç bir məlumat yoxdur. Bu söz ilk dəfə Mahmud Şükrü əl-Alusi tərəfindən “Muxtasar əl-tuhfatul isnəaşəriyyə” kitabında yer verilmişdir [https://ebubekirsifil.com/yazilar/levles-senetan-le-heleken-numan/].

Bəzi alimlər bu sözün Əbu Hənifəyə aid olmadığını, onun Cəfər əs-Sadiqdən yalnız hədis rəvayət etdiyini fiqh, təsəvvüf elmlərini təhsil etmədiyini qeyd edirlər [Zehra Korkmaz, Hayati Yılmaz, s.1170].

**2.3.Elmi fəaliyyəti**

Əbu Hənifə qələmə aldığı əsərlərində əqidə və etiqada dair mühüm məsələlərə toxunmuşdur. O, öz dövründə etiqadla bağlı meydana çıxan təhrifləri düzəltmiş, sağlam inanc əsaslarının sonrakı nəsillərə ötürülməsində mühüm rol oynamışdır. Əbu Hənifənin etiqadi fikirlərini özündən sonra gələn İmam Maturidi təsnif edib sistemləşdirmişdir [Ahmet Ak, c.7, s.223]. Əbu Hənifə daha çox fiqh alimi və məzhəb qurucularından biri olaraq tanınsa da, yazdığı “Fiqhul-Əkbər” əsəri ilə kəlam alimlərindən sayılır. Əbu Hənifə əvvəllər kəlam elmi ilə məşğul olmuş, ancaq sonralar səhabələrin etiqadi məsələlərlə məşğul olmadığını düşünmüş, əməli mövzularda xalqın qarşılaşdığı problemlərin həllini daha əhəmiyyətli saymış və nəticədə fiqh elminə yönəlmişdir.

Əbu Hənifə hədisə böyük dəyər vermişdir. Əbu Hənifə Osman əl-Bəttiyə yazdığı risalədə isə: “Bil ki, öyrəndiyin və insanların faydalandığı şeylərin ən fəzilətlisi Sünnədir”, demişdir. Əbu Hənifə dini məsələlərdə əvvəlcə Allahın Kitabına, sonra Rəsulunun (s.ə.s.) hədislərinə müraciət edər, sonra da səhabələrin görüşlərindən istədiyini seçərdi [https://alathar.net/home/esound/index.php?op=codevi&coid=158123].

Bəzi hədis alimləri Əbu Hənifənin hədislərə müxalif davrandığını demiş və bu elmdəki zəifliyini tənqid etmişlər. Öz müasirlərindən başlayaraq hicri VIII əsrə qədər davam edən, hətta bu gün də görünən həmin ittihamların əksəriyyəti subyektiv fikirlərə əsaslanır [İbn Əbi Xatim ər-Razi, c.VII, s.203]. Bu cür subyektiv yanaşma ilə istənilən alimi nədəsə təqsirləndirmək olar.

Əbu Hənifə vaxtının çoxunu elmə ayırmaqla yanaşı, ticarətlə də məşğul olmuşdur. Bununla halal ruzisini qazanır, alim izzətini qoruyurdu. Qazancını tələbələrinin ehtiyaclarına, elm məclislərinə sərf edirdi. Tələbəsi Əbu Yusifin xərcliyi bitməmiş ona kömək əlini uzadır, imkansız tələbələrinin ailə qurmasına yardım edirdi. Əbu Hənifəni ticarətdə çox həssas davranardı. Əbu

Hənifə bir mal satarkən və ya alarkən qarşı tərəfin zərər çəkməsini əsla istəməzdi. Bir gün bir qadın satmaq üçün ipək paltar gətirir. Əbu Hənifə qiymətini soruşur. Qadın "yüz dirhəm" deyir. Əbu Hənifə alıcı gözü ilə baxıb paltarın dəyərinin yüz dirhəmdən çox olduğunu söyləyir. Qadın qiyməti yüz dirhəm artırır. Əbu Hənifə razı olmur. Qadın da paltarın qiymətini yüz-yüz artıraraq dörd yüzə çatdırır. Əbu Hənifə yenə razı olmur. Qadın da fikirləşir ki, yəqin onu ələ salır. Ən axırda üçüncü bir adamı çağırırlar. O da 500 dirhəm deyir. Əbu Hənifə də ipək paltarı beş yüz dirhəm verib qadından alır. Əbu Hənifənin qazancına haram və şübhəli şeylər qarışdırmazdı. Bir dəfə şəriki Həfs ibn Əbdürrəhman qüsurlu bir parçanı özü də bilmədən qüsursuz parça qiymətinə satmışdı. Bundan xəbər tutan Əbu Hənifə həmin parça topundan gələn bütün gəliri möhtaclara paylamışdı. Əbu Hənifə xarici görünüşə əhəmiyyət verir, təmiz geyinir və insanları da təmiz geyinməyə təşviq edərdi. Elmi müzakirələrlə yanaşı ticarətlə də məşğul olması onu daim həyatın və fiqhi məsələlərin içinə çəkmiş, qarşılaşdığı məsələlər və ya verilən suallarla əlaqədar saysız ictihad və hökmlər vermişdir.

Fiqhi məzhəblər adətən qurucularının vəfatından çox sonralar müəyyən amillərin təsiri ilə formalaşmışdır. Yəni məzhəb alimlərinin məqsədi hansısa məzhəb qurmaq olmamışdır. Hənəfi məzhəbi də həm Əbu Hənifənin, həm də ilk məşhur tələbələrinin vəfatından sonra "Hənəfi məzhəbi" kimi tanınmışdır. Bu gün "Hənəfi məzhəbi" İslam aləmində geniş yayılmış məzhəblərdən biridir [Ali Bardakoğlu, c.XVI, s.2].

**2.4.Əsərləri**

Əbu Hənifə hökm və ictihadlarına, ictihad üsuluna dair bir kitab qələmə almamışdır. Ona istinad edilən əsərlər ümumiyyətlə əqaidlə (etiqadla) əlaqədardır və birbaşa fiqhi məsələlərə aid deyil. Əbu Hənifə fəqih və müctəhid səviyyəsinə çatmış tələbələri ilə müzakirə edər və məsələlərin həll yollarını yazdırardı. Əbu Hənifənin bu günə qədər gəlib çatan "əl-Fiqhul-əkbər", "əl-Fiqhul-övsat", "ər-Risalə", "əl-Alim vəl-mutəəllim" və "əl-Vəsiyyə" kimi əsərləri var. Bu kitablarla əsasən İslam etiqadı ilə bağlı məsələlər izah olunur.

**3.4.1.Əl-Müsnəd**

Rəvayət silsiləsində tanınmış bir alimin yer aldığı hədisleri bir kitabda toplamaq adətinə uyularaq Əbu Hənifənin rəvayət etdiyi hədislər də tələbələri tərəfindən toplanmış və Əbu hənifə müsnədi adı ilə ona nisbət verilmişdir. Bu əsərlərə daxil olan hədislər Əbu Hənifənin fiqh dərslərində və hökmlərində istinad etdiyi hədislər, səhabə və ardıcıllarından nəql etdiyi rəvayətlərdir. Onun şəxsən yazdığı və ya tələbələrindən birinin onun adına köçürdüyü " əl-Müsnəd" adlı əsərin olmadığına dair geniş fikirlər olsa da, iyirmiyə yaxın Əbu Hənifə Müsnədi var ki, onlardan bəziləri çap olunur. Əbu Hənifənin əl-Müsnədi dəfələrlə fiqh fəsillərinə uyğun tərtib edilmişdir. Abdullah bin

Məhəmməd bin Yaqub əl-Harisinin əsəri Əbu Hənifə müəllimlərinə görə, İbn Kutluboğa isə fiqh fəsillərinə uyğun tərtib etmiş və iki cilddə əl-Əmali adı ilə şərh etmiş və dərs məclislərində oxutdurmuşdur.

**3.4.2.Əl-Fiqhul-əkbər**

Hənəfi məzhəbinin banisi Əbu Hənifənin imanla bağlı qısa və yığcam əsəridir. Fiqh məcəllədə “şəri əməllər; məsələləri bilmək” kimi tərif edilsə də, Əbu Hənifə dövründə, müxtəlif elmlər hələ müstəqillik əldə etməmişdir. Kəlam və inanc əsasları bu dövrdə fiqh başlığı altında incələnirdi. Elə buna görə də əsər “əl-Fiqhul-Əkbər (ən böyük fiqh)” adlandırılmışdır. Əliyyul-Qarinin, Əbu Hənifənin digər əsərlərindəki fikirlərini bir araya gətirərək və Fəxrəddin ər-Razi, Taftazani, Konevi kimi alimlərin fikirlərindən faydalanaraq Fiqhul-Əkbər əsərini şərh etmişdir. Əsər bəzi Şərq və Qərb dillərinə tərcümə edilmiş və dəfələrlə nəşr edilmişdir.

**3.4.3.Əl-Fiqhul-övsət**

Əqaidlə bağlıdır və onun oğlu Həmmad və tələbələri Əbu Yusif və Əbu Muti əl-Bəlxi tərəfindən nəql edilmişdir. Bu kitabda əqaidlə bağlı bəzi məsələlərə toxunulmuşdur. Bu məsələlərin bəziləri qədər, iman və günah işləyən birinin kafil olub olmamasıdır. Kitab əsasən məsələsərə sual-cavab şəklində yanaşır.

**3.4.4.Əl-Alim vəl mütəəllim**

Əhli-sünnətin nəzərlərini izah etmək və müdafiə etmək məqsədi ilə sual-cavab üslubunda yazılmış əqidə risaləsidir. Burada əsasən Əbu hənifənin tələbəsi olan Əbu Muqatil Əbu Hənifəyə sual verir və Əbu Hənifədə sualları cavablanırır. Buradada əsas ələ alınan mövzu imandır.

**3.4.5.Ər-Risalə**

Əbu Hənifə, Bəsrə qazisi Osman əl-Bettiyə yazdığı bu əsərində əqidə məsələlərində ona qarşı irəli sürülən ittihamların və iddiaların bəzilərinə cavab verir.

**3.Əbu Hənifə və əhli-rəy**

**3.1.Rəy məktəbi**

İslam düşüncəsi hicrətin II əsrindən etibarən, iki əsas sistemə ayrılaraq yeni inkişaf mərhələsinə qədəm qoymuşdur. Bunlardan birincisi, İraq və ya Kufə məktəbi olaraq tanınan əhli rəy düşüncə sistemi, digəri Hicaz, yaxud Mədinə məktəbi olaraq xatırlanan əhli-hədis sistemidir. Bu iki məktəbin əsas xüsusiyyətlərini qısaca izah edək. Əhli-rəy, adından da göründüyü kimi, əsasən, hüququn inşasında rəyə, yəni əqli fəaliyyətə daha çox üstünlük verən, daha rasional bir üsulu mənimsəyən düşüncə sistemidir. Bunun müqabilində əhli-hədis isə öz hüquq anlayışında nəssə, yəni şəriətin qaynağı olan mətnlərin zahirinə daha çox istinad edən, daha doqmatik bir hüquq anlayışına sahibdir. Sonrakı dövrlərdə əhli-rəy sistemləşdirilmiş və daha fundamental bir hüquqi doktrina kimi, hənəfilik məzhəbi olaraq tarix səhnəsinə çıxmışdır.

Hər iki məktəb meydana çıxdığı zaman kəsiyindən etibarən, öz aralarında ciddi rəqabətdə olmuşdur. Təbii ki, bu rəqabət, sadəcə, elmi-nəzəri fərqliliyin bir nəticəsi olmamış, eyni zamanda, tarixdəki bir çox sosial, siyasi çəkişmələrlə şərtlənmişdir [Vəkilov. R, 2022, s.110].

**3.2.Əbu Hənifə və əhli-rəy**

Əbu Hənifə və onun məzhəbinin əhli-rəy adlandırılmasına gəlincə, bunun səbəblərindən biri də bu məzhəbi təşkil edən fəqihlərin hökm çıxarmaqda rəydən istifadə etmələridir. Ancaq təsadüfi deyil ki, həm İbrahim ən-Nəxai həm də Əbu Hənifə dövründə İraq bölgəsində rəydən tez-tez istifadə olunurdu. Kufə ərəblər, məvalilər, qullar və zimmilər kimi sosial qrupların mövcud olduğu, müxtəlif siyasi və intellektual hərəkatların cəmləşdiyi bir çox müxtəlif mədəniyyət və sivilizasiyalarla sıx əlaqədə olan bir mərkəz idi. Hədis nəqli baxımından Hicaz qədər zəngin olmaması ilə yanaşı, qarşıya çıxan və cavablandırılması lazım olan məsələlərin çoxluğu və müxtəlifliyi rəylə qərar verməyi zəruri edirdi. Siyasi hərəkatların, üsyanların və təlatümlərin şiddətli olduğu bu bölgədə təəssübkeşliyin və ifrat düşmənçiliyin təsiri ilə uydurma hədislər, saxta ittihamlar ortaya çıxmağa və ya bu səbəbdən bir çox səhih hədis şübhəli hala gəlməyə başladı. Bütün bu səbəblər rəvayət olunan hədislərə qarşı ehtiyatlı olmağı zəruri hala gətirmiş və yeni məsələlər qarşısında rəydən istifadə etməyi qaçınılmaz etmişdir. Əhməd Əmin Kufə məktəbinin üzvlərinin əksəriyyətinin yəmənlilər olduğunu və Muaz bin Cəbəldən təsirləndikləri üçün rəyi bu dərəcədə istifadə etdiklerini deyir [Esat Kılıçer, c.10, s.522].

Xüsusilə Hicaz əhli və hədis alimlərinin Əhli-Rəyə qarşı rəftarının digər səbəbi də alimlər və məktəblər arasında tez-tez görülən elmi rəqabətdir. Digər səbəb kimi ərəb-məvali qarşıdurması göstərilə bilər. Çünki hər bölgə və məktəb öz müəllimlərini elm baxımından üstün, rəvayətlərini isə daha etibarlı hesab edirdi. Necə ki, İbn Uyeynənin rəy bidətinin ortaya çıxmasını məvaliyə aid etdiyi və belə dediyi bildirilir: “Əbu Hənifə ortaya çıxana qədər Kufə əhalisinin vəziyyəti mötədil idi [Esat Kılıçer, c.10, s.523].

Əhli-Rəyin əsas yanaşmalarını aşağıdakı kimi ümumiləşdirmək olar:

1. Yeni məsələlərin həllində rəydən daha çox istifadə edilirdi.
2. Rəy ilə hökm verməyi fərzi məsələləri də əhatə edəcək çəkildə inkişaf etdirib sistemləşdirmişdir.
3. Sünnənin təyinində Qurani-Kərim, mərfu, mövquf və məqtu hədis olmaqla qaynaqların hər biri əsas alınırdı.
4. Hədislərin sağlamlığını təyin etməkdə ehtiyatlı davranır və ravilərin doğruluğu ilə qane olmayıb hədisləri Qurani-Kərimə ərz edirdi.
5. Rəvayətlər dinin əsas qaynaqlarından əldə edilən üsullara, ümumi qaydalara, və məhşur sünnəyə ziddirsə rədd edilməlidir.

6. Rəvayətlər imamlar tərəfindən düzəldilib tərtib edilən ümumi qaydalar çərçivəsində ələ alınmalıdır.
7. İlk üç nəslin hədisləri dəlil olaraq istifadə edilir.
8. Hədislər ləfzi olaraq yorumlanmamalıdır [Ahmet Yücel, 2014, s.229].

Əhli-hədis bəzi məsələlərdə əhli-rəyə qarşı rəddiyyələr vermişdir. Onlardan bəziləri bunlardır.

**3.3.Mürsəl hədisləri dəlil olaraq istifadə edirlər**

Yuxarıda qeyd edildiyi kimi, əhli-rəy ilk üç nəslin mürsəllərinin dəlil olaraq istifadə olunacağı qənaətindədir. İmam Şafii və əhli-hədisə görə, hədisin səhih olmasının ən əsas şərtlərindən biri onun rəvayətinin mütəsil olmasıdır. Hədis əhlinə görə mürsəl, zəif hədis növlərindəndir. Zəif sayılmasının səbəbi ilk iki əsrdə hədis alimlərinin mötəbər ravilərlə yanaşı, zəif ravilərin də hədisləri nəql etmələridir [Ahmet Yücel, 2014, s.233]. Əbu Davudun verdiyi məlumata görə, İmam Şafiidən əvvəl ikinci əsrdə yaşayan alimlər, Süfyan əs-Səvri, İmam Malik, Əvzai mürsəl hədisi dəlil kimi istifadə edirdilər. Mürsəl hədis dəlil olma məsələsini ilk dəfə tənqid edən İmam Şafii olmuş, sonra isə Əhməd b. Hənbəl və başqa alimlər onun görüşlərini qəbul etmişlər [Ahmet Yücel, 2014, s.232].

**3.4.Əbu Hüreyrənin rəvayətlərinə qarşı ehtiyatlı davranırlar**

Əhli-hədis Əhli-rəyin ehkam mövzularında səhabə nəslindən fəqih olan ravilərin rəvayətlərini tərcih etmək məqsədi ilə xüsusi ilə Əbu Hüreyrənin nəqllərini ehtiyatla qarşılamasını tənqid etmişdir. Bunun əslinə baxdığımız zaman bunun bir çox səbəbini görmüş olarıq. Birinci səbəb olaraq deyə bilərik ki Əbu Hüreyrənin bəzi əməli mövzularda özü rəvayət etdiyi hədisə əks hərəkət etdiyini görürük.

Məsələn: Əbu Hüreyrə Peyğəmbərin belə dediyini nəql etmişdir: "Birinizin qabını it yaladığı zaman, içindəkini töksün, sonra qabı biri torpaq olmaqla yeddi dəfə yusun". Ancaq Əbu Hüreyrə rəvayət etdiyi bu hədisin əksinə əməl etmiş və buna zidd fətva vermişdir. Belə ki, itin yaladığı bir qabı üç dəfə yumuşdur. Bu hadisə onun rəvayətini zəif və şüphəli hala gətirmişdir. Buna görə də, başda Əbu Hənifə olmaqla hənəfilər onun bu rəvayəti ilə əməl etməmişlər. Onlar bu rəvayətin nəsx edildiyini düşünərək, itin yaladığı qabın üç dəfə yuyulmasına hökm vermişlər [Kahraman. A, s.85].

**4.Nəticə**

Bildiyimiz kimi ilk dönəmdə əhli hədis, əhli əməl və əhli rəy məktəbləri mövcud idi. Həmin dövrə nəzər yetirdiyimiz zaman görə bilərik ki o dövrdə rəyi sistemləşdirdiyinə görə Əbu Hənifəyə çoxlu rəddiyyələr yazılmışdır. Çünku onun fiqh məktəbinin ən bariz xüsusiyyəti qarşıya çıxan və ya həllini gözləyən məsələlərə Quran və Sünnədə keçən bilgilər əsasında rəy və ictihaddan da faydalanaraq cavab axtarılması idi. Rəy və ictihada müraciət etmədən birbaşa hədislər əsasında hökm çıxarma üsulu olan “hədis fiqhi”

Əbu Hənifənin yaşadığı dövrdə demək olar ki, yox idi. Əbu Hənifə və tələbələrinin ortaya qoyduğu "rəy fiqhi" isə, Quran və Sünnədə keçən bilgiləri rəy və ictihadla zənginləşdirərək, hədislərlə rəy arasında tarazlığı qoruyaraq yeni hökmlər çıxarırdı. Həmin dövrdə də islam çoxlu mədəniyyətlərlə bir arada yaşadığına görə onların suallarına nəsslə cavab tapmaq mümkün olmurdu bu səbəblə də o bəzi məsələlərdə rəy ilə hökm verməyin tərəfdarı idi. Hər nə qədər ilk dönəmdə tənqid edilsə də sonraki dönəmə nəzər yetirdikdə görərik ki bir çox islam alimi rəyi qəbul etmiş və onunla hökm vermişdir. Nəticə olaraq deyə bilərik ki, rəy yəni bir məsələyə müəyyən çərçivə daxilində ağılla cavab vermə prosesi tabiun alimlərindən olan İbrahim əl-Nəxai tərəfindən başladılmış və daha sonra Əbu Hənifə tərəfindən daha çox istifadə edilmiş və sistematik bir qayda halına gəlmişdir. Təbi ki bu məktəbin yaranması və sistemləşməsi çox zəruri hallardandır. Əbu Hənifənin yaşadığı mühitə və zamana baxdığımızda bunu açıqca görürük; çünkü, onun dövründə Küfədə bir çox mədəniyyətli müsəlmanlar yaşayırdılar və onların verdikləri bəzi suallar nə Hz peyğəmbər nə də səhabə dönəmində görülməmişdir. Bundan yola çıxaraq rəy zəruri hala çevrilmişdir. Əgər rəydən istifadə olunmasaydı insanlar öz suallarına cavab tapa bilməyəcəkdilər. Beləliklə islamın naqis oldğu və ümumşümul olmadığı qənaətinə gələcəkdilər. Bunun qarşısını almaq məqsədi ilə qurulan rəy məktəbi doğru bir yol izləmiş və nəssdə olmayan mövzulara nəss konteksində içtihad edərək cavab vermişdir. Nəticə olaraq gəldiyim qənaət yuxarda sadaladığım səbəblərə dayanaraq rəyin zəruri olduğudur. Rəysiz verilən suallara cavab vermək mümkün deyildir.

## ƏDƏBİYYAT

**1.** Muhammed Əbu Zəhra, (1997). *Əbu Hənifə*, Ankara, DİB yay, (tərcümə Kesikoğlu, O.), 504 s.
**2.** Uzunpostalcı, M. *Ebu Hanife*. DİA, c. X, s. 131-132. (8 s.)
**3.** https://alathar.net/home/esound/index.php?op=codevi&coid=158123
**4.** İbn Əbi Xatim ər-Razi, (1952). *Kitəbul-Cərh vət-Tədil*. Beyrut, Dəru ihyəi əl-tərasu əl-arabi, c. VII, 348 s.
**5.** Uzunpostalcı, M. (1986). *Ebû Hanîfe Hayatı ve İslâm Fıkhındaki Yeri* (doktora tezi, 1986), Sosyal Bilimler Enstitüsü, s. 56-202.
**6.** Yücel, A. (2014). *Temel İslam bilimlerinin ortaya çıkışı ve birbirleriyle ilişkisi*. İstanbul, Ensar nəşriyat, 624 s.
**7.** Kahraman, A. (2007). *Fiqh Üsulu*. Nurlar nəşriyat, Bakı, 272 s.
**8.** İbn Həcər Heytəmi, (2007). *Xayratul-Hisan*. Dəməşq, Dəru əl-hidəyə və əl-rişəd, 193 s.
**9.** Şaranı, Təbəqatul-Kübra, Qahirə, Məktəbətul ədəb yayınları, 2017, c. I, 182 s.

**10.** Keskioğlu, O. (1960). *İmam Azam*. Ankara, Güzel sanatlar matbaası, 133 s.
**11.** Galip, T. (2007). *Ebu Hanife ve Ehli Sünnet kelamının oluşumunda etkisi*. Isparta, 498 s.
**12.** Səyi, A. (2008). *Hayatu Əbi Hanifətə*. Qahirə, 239 s.
**13.** Ak, A. (2010). Mâturîdîliğin Hanefilik ile İlişkisi. *Milel ve Nihal, 7*(2), s. 223-240.
**14.** *İslam Araştırmaları Dergisi, İstanbul, c. 15*, Sayı: 1-2, 2002, s. 3
**15.** Kılıçer, E. (1994). *TDV İslam Ansiklopedisi*. İstanbul, c.10, s. 520-524
**16.** Məhəmməd Əbu Zəhra, (2008). *İmam Cəfər*. Qahirə, Dəru əl-fikru əl-arabiyi, 567 s.
**17.** Korkmaz, Z., & Yılmaz, H. (2019). Ca‘fer es-Sâdık ve Ebû Hanîfe Arasındaki Hoca-Talebe İlişkisi. *Tasavvur: Tekirdağ İlahiyat Dergisi 5(2)* (Aralık 2019): 1151-1181.
**18.** https://ebubekirsifil.com/yazilar/levles-senetan-le-heleken-numan/
**19.** Vəkilov, R. (2022). Əhli-hədis və əhli-rəy mübahisələri müstəvisində istehsan dəlilinin dəyişmə seyri. Bakı, *Din araşdırmaları 2* (9), s. 110.
**20.** Bardakoğlu, A. (1997) *Hanefi mezhebi*. DİA, c. XVI, s. 1-21.

# Абу Ханифа и школа Отзыва

**Абдулла Алиев***
**Аслан Габибов****

**Абстракт.** Как известно на начальном периоде Ислама, т.е. в период Пророка и сподвижников отвечать на возникшие вопросы не создавало трудностей. Но просматривая следующие периоды, мы видим, что личности, обладавшие новой культурой и новопринявшие Ислам, задавали новые вопросы. Отвечать на эти вопросы, основываясь на Коран и Сунну, создавало сложности. Поэтому ученые города Куфа считали важным отвечать на вопросы при помощи «иджтихада» и отзывов. В данный период и дальнейших этапах при «иджтихаде» они обращались к отзывам, что вызывало много критики. Больше всех критиковали таких рецензентов школа Хадисов, которая являлась одной из двух основных школ своего периода. Начиная с начального формирования фикха, Школа Хадисов обвиняла иракскую школу в отказе от книг и сунны и предпочтении решать религиозные выводы при помощи умственных методов. Данный умственный метод, исследованный нами, являлся объектом критики на разных этапах истории и предоставлялся под разными названиями (отзыв, «гийас», «истехсан»).

Одним из таких известных ученых был Абу Ханифа, подвергнутый критике представителей хадисов. В данной статье рассмотрены жизнь и творчество, труды и школа Отзыва Абу Ханифы.

**Ключевые слова:** фикх, Абу Ханифа, мазхаб, представители хадисов, рецензенты

* Магистрант по специальности «Исламоведение» Азербайджанского Института Теологии; Баку, Азербайджан (ответственный автор)
E-mail: abdullaeliyev2023.@gmail.com
https://orcid.org/0009-0004-6318-7121
** Доктор философии по теологии,
доцент, научный сотрудник Института Востоковедения имени академика З.Буниятова, НАНА; Баку, Азербайджан
E-mail: aslanhabibov@ait.edu.az
https://orcid.org/0000-0002-3016-3324
**Цитировать статью:** Алиев, А., & Габибов, А. [2024]. Абу Ханифа и школа Отзыва. *Журнал «Metafizika», 7(1),* с.64-76
https://doi.org/10.33864/2617-751X.2024.v7.i1.64-76

**История статьи:**
*Статья поступила в редакцию: 13.11.2023*
*Отправлена на доработку: 11.12.2023*
*Принята для печати: 29.01.2024*

## Abu Hanifa and the School of Raʾy

**Abdulla Aliyev***
**Aslan Habibov****

**Abstract.** As it is known, in the early Islamic period, that is, during the time of the Prophet and his companions it was not difficult to find answers to the questions. However, when we look at the later periods, we see that people who had just accepted Islam, belonging to many new cultures, asked new questions. It was not so easy to answer these questions merely based on the Qur'an and the Sunnah. For this reason, Kufa scholars considered it necessary to use ijtihad with raʾy (free legal reasoning). They were subjected to a lot of criticism in that period and today because they resorted to raʾy while doing ijtihad. One of the two main schools that criticized the Ahl al-Ra’y the most was the Ahl al-Hadith (people of hadith) school. From the early days of the formation of the Hadith school of jurisprudence, the Iraqi school has been accused of abandoning the book and the Sunnah in the interpretation of Shari'ah rulings and preferring the rulings obtained by the intellectual method. This intellectual method that we are talking about has been the target of criticism in certain historical periods, sometimes in the name of ra’y, sometimes inthe name of qiyas (analogy), and sometimes in the name of istihsan.

Abu Hanifa is one of the famous scholars who have been criticized by Ahl al-Hadith. This article deals with the life, works and school of ra’y of Abu Hanifa.

**Keywords:** jurisprudence, Abu Hanifa, mazhab, ahl al-hadith, ahl al-ra’y

## REFERENCES

1. Muhammad Abu Zahra, (1997). *Abu Hanifa*. Ankara, DİB summer, (translated by Kesikoğlu, O.), 504 p. (in Turkish)
2. Uzunpostalcı, M. *Ebu Hanife*. DIA, c. X, p. 131-132. (8 p.) (in Turkish)
3. https://alathar.net/home/esound/index.php?op=codevi&coid=158123

* Master's student in Theology Institute of Azerbaijan; Baku, Azerbaijan (corresponding author)
E-mail: abdullaeliyev2023.@gmail.com
https://orcid.org/0009-0004-6318-7121
** Doctor of Philosophy (Ph.D) in Theology,
Leading researcher of the Institute of Oriental Studies named after Academician Ziya Bunyadov of ANAS; Baku, Azerbaijan
E-mail: aslanhabibov@ait.edu.az
https://orcid.org/0000-0002-3016-3324

**To cite this article:** Aliyev, A., & Habibov, A. [2024]. Abu Hanifa and the School of Raʾy. *“Metafizika” journal, 7(1),* pp.64-76.
https://doi.org/10.33864/2617-751X.2024.v7.i1.64-76

**Article history:**
*Received: 13.11.2023*
*Accepted: 29.01.2024*

**4.** Ibn Abi Khatim al-Razi, (1952). *Kitabul-Jarh wat-Tadil*. Beirut, Daru ihyai al-tarasu al-arabi, c. VII, 348 p. (in Azerbaijani)
**5.** Uzunpostalcı, M. (1986). *Life of Abu Hanifa and His Place in Islamic Jurisprudence* (doctoral thesis, 1986), Institute of Social Sciences, p. 56-202. (in Turkish)
**6.** Yücel, A. (2014). *The emergence of basic Islamic sciences and their relationship with each other*. Istanbul, Ensar publications, 624 p. (in Turkish)
**7.** Kahraman, A. (2007). *Fiqh Method*. Nurlar publishing house, Baku, 272 p. (in Turkish)
**8.** Ibn Hajar Heytami, (2007). *Khayratul-Hisan*. Damascus, Daru al-hidaya wa al-rishad, 193 p. (in Azerbaijani)
**9.** Sharani, Tabaqatul-Kubra. Cairo, Moqabatul Adab Publications, 2017, c. I, 182 p. (in Azerbaijani)
**10.** Keskioğlu, O. (1960). *Imam Azam*. Ankara, Fine Arts Printing House, 133 p. (in Turkish)
**11.** Galip, T. (2007). *Abu Hanife and his influence on the formation of the Ahl al-Sunnah theology*. Isparta, 498 p. (in Turkish)
**12.** Seyi, A. (2008). *To Hayat Abi Hanifat*. Cairo, 239 p. (in Azerbaijani)
**13.** Ak, A. (2010). *The Relationship between Maturidiism and Hanafiism*. Milel and Nihal, 7(2), p. 223-240. (in Turkish)
**14.** *Journal of Islamic Studies, Istanbul, vol. 15, Issue: 1-2,* 2002, p. 3 (in Turkish)
**15.** Kılıçer, E. (1994). TDV Islamic Encyclopedia. Istanbul, vol.10, p. 520-524. (in Turkish)
**16.** Muhammad Abu Zahra, (2008). *Imam Jafar*. Cairo, Daru al-fikru al-arabiyi, 567 p. (in Azerbaijani)
**17.** Korkmaz, Z., & Yılmaz, H. (2019). Teacher-Student Relationship Between Ca'fer es-Sâdık and Abu Hanife. *Tasavvur: Tekirdağ Journal of Theology 5*(2), (December 2019): 1151-1181. (in Turkish)
**18.** https://ebubekirsifil.com/yazilar/levles-senetan-le-heleken-numan/
**19.** Vakilov, R. (2022). The course of change of evidence of istehsan at the level of Ahl-e-Hadith and Ahl-Ray disputes. Baku, *Religious studies 2*(9), p. 110. (in Azerbaijani)
**20.** Bardakoğlu, A. (1997). *Hanafi sect*. DIA, c. XVI, p. 1-21. (in Turkish)